**UOT: 634.222.232.543.8.86**

# YENİ İNTRODUKSİYA OLUNMUŞ GİLAS VƏ GAVALI SORTLARININ KEYFİYYƏT GÖSTƏRİCİLƏRİ

**İ.A.BƏYƏHMƏDOV**
**Quba Regional Aqrar Elm və İnformasiya Məsləhət Mərkəzi**

*Məqalədə Azərbaycana yeni introduksiya olunmuş gilas və gavalı sortlarının əmtəə və keyfiyyət göstəriciləri ilə bağlı tədqiqat nəticələri haqda məlumat verilir. Müəyyən olunmuşdur ki, təzə halda istifadə üçün meyvə məhsulu klon calaqaltılar üzərində becərilən sortlarda, emal sənayesi üçün nəzərdə tutulmuş məhsul isə toxmacar calaqaltısı üzərində becərilən sortlarda daha çox olur. Eyni zamanda təhlillərlə müəyyənləşdirilmişdir ki, yeni introduksiya olunmuş gilas və gavalı sortlarının kimyəvi tərkibi əvvəllər introduksiya edilmiş sortlarla müqayisədə kəskin şəkildə fərqlənməsə də, bu sortlarda bir meyvənin orta kütləsinin böyük olması, meyvələrin uzun müddətli saxlanmaya və nəqliyyata davamlılığı, meyvə qabığının daha parlaqlığı, bu sortların üstün göstəricilərindən hesab olunur.*

***Açar sözlər:****.Gilas, gavalı, sort, introduksiya, keyfiyyət göstəriciləri, əmtəəlik məhsul, kimyəvi tərkib.*

Vacib təsərrüfat əhəmiyyətli məsələlərdən biri də məhsulun nə dərəcədə keyfiyyətli olmasıdır. Bununla bağlı Quba-Xaçmaz bölgəsində apardığımız tədqiqatlarda bu məsələyə diqqət yetirilmiş və yayılmış gilas və gavalı sortlarının bir çox təsərrüfat-bioloji xüsusiyyətlərilə yanaşı, əmtəəlik keyfiyyət göstəricilərindən hesab edilən kimyəvi tərkib də müəyyən edilmişdir. Bölgədə yayılmış gilas sortlarında digər tədqiqatçıların verdiyi məlumata görə həll olunan quru maddə 11,0-17,7%, ümumi şəkər 9,31-15,6%, turşuluq 0,42-0,76%, C vitamininin miqdarı isə 4,1-7,7 mq% təşkil edir. Sortlar arasında müqayisədə yüksək keyfiyyət göstəricisi Raya sortunda müşahidə olunmuşdur. Həmin sortda quru maddə 17,7%, ümumi şəkər 15,6%, C vitamininin miqdarı isə 7,7 mq% olduğu qeyd olunur [2;3].

Meyvələrinin yüksək dad keyfiyyəti və ağacların şaxtaya davamlılığına görə gavalı, meyvə bitkiləri içərisində yüksək qiymətləndirilir. Gavalı meyvələri zəngin tərkibli və qidalıdır. Meyvələrinin tərkibində 17%-ə qədər şəkər, 0,16-2,28% turşular (əsasən alma və limon turşusu) 0,15-1,05% dabaq maddələri, C və P vitaminləri vardır. Toxumlarda 31-42 % yağ və 0,3-0,46% amiqdalin olur [1;2].

Eyni zamanda gilas və gavalı meyvələrinin kimyəvi tərkibinin formalaşmasına sort xüsusiyyəti ilə yanaşı bir çox amillərin (gübrələmə, suvarma, formavermə və s.) də təsiri ilə bağlı məlumatlar mövcuddur [4; 5; 6].

**Tədqiqatın şəraiti, materialı və metodları.** Təhlillər ölkənin Şimal-Şərq rayonlarında- Quba və Qusar rayonları şəraitində aparılmışdır. Belə ki, Qusar rayonu Yeni Həyat kəndi ərazisində gilasın Maxima-14 calaqaltısı üzərində 5x4 m əkin sxemi ilə 2008-ci ildə əkilmiş və damla suvarma sistemi qurulmuş Belge, Burlat, Summit, Kordia, Regina sortları və gavalının isə MİR-29 C calaqaltısı üzərində 5x4 m əkin sxemi ilə 2009-cu ildə əkilmiş və damla suvarma sistemi qurulmuş Angelina, Black Amber, Fortune, Prezident, Stanley sortları götürülmüşdür.

Eyni zamanda Quba rayonu Qaraçay kəndi ərazisində gavalının cır alça_calaqaltısı üzərində olan 7x5 m əkin sxemi ilə 2003-cü ildə əkilmiş Anna Şpet, Xurmayı Vengerka və İtalyan vengerkası sortları və Quba rayonu Barlı kəndi ərazisində gilasın cır gilas calaqaltısı üzərində olan 8x6 m əkin sxemi ilə 2003-cü ildə əkilmiş Öküz ürəyi, Sarı Draqana və Napaleon sortları tədqiq edilmişdir.

Tədqiqat işi bağçılıq üzrə ümumi qəbul edilmiş metodlar əsasında yerinə yetirilmişdir [7].

Gilas və gavalı sortlarının kimyəvi tərkibinin öyrənilməsi məqsədilə təhlillər MÇETİ-nin texnologiya, biokimya və meyvələrin emalı laboratoriyasında aparılmışdır. Bu zaman əsasən ümumi və həll olan quru maddə, şəkər, titirləşən turşuluq, dabbaq və rəngləyici maddələr, askorbin turşusu təyin olunmuşdur. Həll olan quru maddə refratometrik üsulla, turşuluq qələvi məhlulunda titirləşməklə, C vitamini Tilsman reaktivinin köməkliyi ilə, şəkərlər Bertrana görə, dabbaq maddələri Neybayepə və Leventala görə müəyyən edilmişdir [8].

**Tədqiqatın nəticələri və onların müzakirəsi.**

Bölgə üçün yeni və əvvəllər introduksiya edilmiş gilas və gavalı sortlarının kimyəvi tərkibinin tərəfimizdən aparılmış təhlil nəticələri 1 və 2 saylı cədvəllərdə verilir. Cədvəldən göründüyü kimi, gilas bitkisinin yeni introduksiya olunmuş Belge, Burlat, Summit, Kordia, Regina sortlarında bir meyvənin kütləsi 8,5-11,5 q, əvvəllər introduksiya edilmiş Kəl ürəyi, Sarı Droqana və Napoleon sortlarında isə 5,7-6,7q təşkil etmişdir. Meyvələrin tərkibində olan həll olan quru maddə, ümumi şəkərlər, turşuluq, C vitamini isə sortlardan asılı olaraq az dəyişmişdir. C

vitamini ən çox Kəl ürəyi (4,57 mq%) və Belge (3,17 mq%) sortlarında qeydə alınmışdır.

**Cədvəl 1.**
**Gilas meyvələrinin kimyəvi tərkibi**

| Sort | Meyvənin orta kütləsi, q | Həll olan quru maddə | Nəmlik, % | Şəkərlər, % | | | Turşuluq, % | C vitamini, mq% |
|---|---|---|---|---|---|---|---|---|
| | | | | Saxaroza | Monosaxaridlər | Ümumi | | |
| Belge | 9,9 | 16,7 | 82,2 | 0,08 | 12,88 | 12,96 | 0,78 | 3,17 |
| Burlat | 8,5 | 15,0 | 83,5 | 0,36 | 14,15 | 14,52 | 0,74 | 2,78 |
| Summit | 11,5 | 13,0 | 85,2 | 0,82 | 8,17 | 8,99 | 0,6 | 2,11 |
| Kordia | 8,7 | 14,3 | 84,3 | 0,19 | 10,71 | 10,9 | 0,67 | 2,82 |
| Regina | 9,1 | 17,0 | 81,1 | 0,12 | 12,41 | 12,53 | 0,63 | 2,99 |
| Kəl ürəyi | 6,2 | 20,0 | 78,4 | 0,36 | 14,15 | 14,52 | 0,6 | 4,57 |
| Sarı Droqana | 5,7 | 19,5 | 80,8 | 0,27 | 12,51 | 12,78 | 0,72 | 2,29 |
| Napoleon | 6,7 | 23,5 | 76,0 | 0,43 | 12,25 | 12,68 | 0,65 | 2,82 |

**Cədvəl 2.**
**Gavalı meyvələrinin kimyəvi tərkibi**

| Calaqaltı | Sort | Meyvənin orta kütləsi, q | Həll olan quru maddə | Nəmlik, % | Şəkərlər, % | | | Turşuluq, % | C vitamini, mq% | Dabbaq və rəngləyici maddələr, % |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | | Saxaroza | Monosaxa-ridlər | Ümumi | | | |
| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 | 9 | 10 | 11 |
| Cır alça | Anna Şpet | 44,2 | 13,0 | 85,3 | 4,8 | 3,25 | 8,05 | 2,34 | 3,52 | 0,15 |
| | Xurmayı Vengerka | 40,5 | 13,8 | 85,5 | 2,1 | 4,75 | 6,85 | 2,0 | 3,87 | 0,20 |
| | İtalyan Vengerkası | 34,6 | 16,4 | 83,7 | 2,75 | 5,11 | 7,86 | 1,34 | 3,87 | 0,20 |
| MİR-29C | Angelena | 75,0 | 14,1 | 83,6 | 0,93 | 5,88 | 6,81 | 1,1 | 1,94 | 0,20 |
| | Blək Amber | 79,0 | 15,0 | 81,5 | 3,32 | 5,54 | 8,86 | 0,84 | 2,11 | 0,15 |
| | Fortune | 89,6 | 11,2 | 86,58 | 0,49 | 6,68 | 7,17 | 1,79 | 2,29 | 0,15 |
| | Prezident | 42,0 | 19,5 | 77,5 | 0,86 | 10,44 | 11,3 | 0,52 | 2,11 | 0,20 |
| | Stanley | 45,0 | 16,6 | 81,3 | 4,07 | 6,05 | 10,12 | 0,55 | 1,94 | 0,20 |

Yeni introduksiya olunmuş gilas sortlarının kimyəvi tərkibi əvvəllər introduksiya edilmiş gilas sortları ilə müqayisədə kəskin şəkildə fərqlənməsə də, bu sortlarda bir meyvənin orta kütləsinin böyük, meyvələrin uzun müddətli saxlanmaya və nəqliyyata davamlılığı, meyvə qabığının daha parlaq olması, bu sortların üstün göstəricilərindən hesab olunur.

Qeyd olunanlardan belə bir nəticəyə gəlmək olar ki, gilas bitkisi bölgədə əmtəəlik məhsul istehsalı üçün yüksək dərəcədə səmərəli meyvə bitkilərindəndir.

Apardığımız tədqiqatlarda bölgədə becərilən gavalı sortlarının əmtəəlik keyfiyyətlərini müəyyənləşdirməyə səy göstərmişik (Cədvəl 2).

2 saylı cədvəl rəqəmlərindən göründüyü kimi tədqiq etdiyimiz sortlar içərisində bir meyvənin orta kütləsinə görə birinci yerdə Fortune sortu durur ki, bu sort üzrə göstərici 89,6q təşkil edir. Meyvənin kütləsinə görə ikinci yerdə (79,0q) Blək Amber sortu durur. Angelena sortu isə Blək Amber sortundan azacıq fərqlənərək bir meyvənin kütləsi 75,0q həddində qeydə alınmışdır. Digər sortlarda isə meyvələrin kütləsi bir qədər kiçik olmaqla sortlar üzrə 34,6-45,0q təşkil etmişdir. Həll olan quru maddənin miqdarına görə tədqiq olunan gavalı sortları içərisində birinci yerdə Prezident sortu (19,5 %), ikinci yerdə İtalyan Vengerkası və Stanley sortları (müvafiq olaraq 16,4-16,6 %), sonrakı yerlərdə isə müvafiq olaraq Anna Şpet, Xurmayı Vengerka, Angelena, Blək Amber sortları (13,0-15,0 %) durur. Ən az (11,2%) həll olan quru maddə isə Fortune sortunda aşkarlanmışdır. Meyvənin tərkibində toplanan ümumi şəkərlərin miqdarına görə də birinci yerdə Prezident və Stanley sortları (10,12-11,3 %) dururlar. Digər sortlarda isə bu göstərici bir-birinə yaxın olmaqla 6,81-8,86 % arasında tərəddüd edir. Meyvələrin tərkibində mövcud olan turşuluq və C vitamini sortlardan asılı olaraq müəyyən qədər fərqlənmişdir. Bu zaman ən çox (2,34 %) turşuluq Anna Şpet sortunda, C vitamini isə Xurmayı Vengerka və İtalyan Vengerkası sortlarında (3,87%) müşahidə olunur. Meyvənin tərkibində olan turşuluğun azlığı ilə Prezident və Stanley sortları (0,52-0,55 %), C vitamininin azlığı ilə isə Angelena və Stanley sortları (1,94 %) fərqlənmişdir. Meyvələrin tərkibində olan dabbaq və rəngləyici maddələrin miqdarının, orta hesabla 0,15-0,2 % arasında olduğu qeydə alınmışdır.

## ƏDƏBİYYAT


1. Həsənov Z.M., Əliyev C.M. Meyvəçilik. Bakı, 2011, 519 s. 2. Həsənov Z.M. Meyvələrlə müalicə. (Pomoterapiya). Bakı, 2017, 128 s. 3. Sadıqov Ə.N., Babayev M.N., Mərdanov Q.M. Quba-Xaçmaz bölgəsində yayılmış gilas bitkisinin kimyəvi tərkibi. Ə.S.Nərimanovun 100 illiyinə həsr olunmuş "Aqrar elmin zənginləşdirilərək təkmilləşdirilməsi əsasında ərzaq təhlükəsizliyinin təmini problemləri" elmi-praktik konfransın materialları, Bakı: Müəllim, 2011, s. 354-356. 4. Матвеев В.А., Васильева М.Н., Волот В.С. Новый сорт сливы домашней Венгерка белорусская. «Интенсификация плодоводства Беларуси: Традиции, достижения, перспективы». Материалы международной научной конференции. Национальная Академия Наук Беларуси. Самохваловичи, 2010, с. 56-58. 5. Поух Е.В., Иванова О.С., Мацеюк М.В. Сорт сливы President (Президент). Плодоводства.

Национальная Академия Наук Беларуси. Самохваловичи, 2016, Том, 28, с. 105-110. 6. Трунов Ю.В., Соловьев А.В, Трунова Л.Б. и. др. Формирование качества плодов в современных интенсивных садах. Интродукция, сохранение и использование биологического разнообразия культурных растений. Материалы XI международной научно- методической конференции 9-13 июня 2014 г. Часть 2, Махачкала 2014, с. 297-301. 7. Учеты, наблюдения анализы, обработка данных в опытах плодовыми и ягодными (методические указание) / Под ред. Г.К. Карпенчука и А.В. Мельника. Умань: Уманский СХИ, 1987, 115 с. 8.Шириков Е.П. Практикум по технологии хранения и переработки плодов и овощей. М.: Агропромиздат, 1985, 191 с.

**Качественные показатели новых интродуцированных сортов сливы и черешни**

**И.А.Бейахмедов**

В статье приведены сведения о результатах проведенных исследований по товарным и качественным показателям новых интродуцированных сортов черешни и сливы в Азербайджане. Было определенно, что для свежего использования пригодны урожаи плодовых на клоновых подвоях, а направленные для переработки плоды бывают больше на сеянцевых подвоях. Одновременно, на основе проведенных анализов определено, что при сравнении химического состава плодов новых интродуцированных сортов черешни и сливы и раньше интродуцированных сортов не так отличаются. Однако преимущественными показателями этих сортов считается большая средняя масса одного плода, устойчивость к длительному хранению, транспортировке и более яркой окраски кожуры плода.

***Ключевые слова:*** *Черешня, слива, сорт, интродукция, качественные, показатели, товарный урожай, химический состав.*

**Quality indicators of new investigated cherry and plum sorts**

**İ.A.Beyehmedov**

The article provides information on the research results of the newly introduced to Azerbaijan cherry and plum varieties on commodity and quality indicators. It was identified that fruit crops are more in varieties cultivated on cloned rootstocks for fresh using, but products intended for the processing industry are more common on cultivated seedling rootstocks. At the same time, it was determined by analysis that the chemical composition of newly introduced cherry and plum varieties did not differ sharply from the previously introduced varieties but it is considered the superior indicators the large mass of a fruit on this varieties, storage for a long-term and transport sustainability of the fruits, more brightness of the fruit crust.

***Key words:*** *Cherry, plums, sort, introduction, quality indicators, commodity product, chemical composition.*

